**ELFİRA BAĞIRZADƏ**
**Azərbaycan Dövlət İqtisad Universiteti**
**İstiqlaliyyət küç.6.**
**elfira.@.mail.ru.**

# ƏDƏBİ DİL NORMALARININ FORMALAŞMASINDA ŞİRVAN DIALEKT FAKTORUNUN ROLU VƏ ƏHƏMİYYƏTİ

## Xülasə

Dil ona olan tələbatı yerinə yetirmək və insanlar arasında ünsiyyət vasitəsi olmasını qoruyub saxlamaq üçün öz daxilində daim yenilənmələrlə müşahidə olunur. Ədəbi dilin formlaşmasında bir sıra faktorlar əhəmiyyət daşıyır ki bunlardan da birinci olaraq dialekt faktorunu qeyd etmək olar. Ədəbi dil daim dialektlərlə üzvi şəkildə əlaqəli olur. Dialektlər adəbi dilin zənginləşməsinda mühüm əhəmiyyət daşıyır. Belə ki, ədəbi dil inkişaf etdikcə ona lazım olan sözləri əldə etmək üçün daim dialektlərdən faydalanır və özünü zənginləşdirir Ədəbi dili dialektsiz təsəvvür etmək qeyri-mümkündür. Dil tarixi hadisə olduğu üçün onun daxilində dəyişikliklər baş veir. Dəyişiklik dedikdə bunun dilin tam olaraq yeni formaya keçməsi kimi başa düşülməsi düz olmaz. Zamanla dildə olan bir norma öz yerini digər bir normaya verir. Bu proses zamanı dialekt faktoru xüsusi rol oynayır. Hər bir ədəbi dilin əsas qida mənbəyi dialektlərdir. Ədəbi dildə norma anlayışı seçmə əməliyyatının aparılması üçün dildə olan variantların olması ilə əlaqəlidir. Əgər variantlar mövcud deyilsə, o zaman har hansı bir normadan söhbət açmağa ehtiyac qalmır." Norma problemi o halda meydana gəlir ki, dil sistemində eyni hadisənin istifadəçisi olan variantlar mövcud olsun.Dildə bu variantlılığın əsas mənbəyi kimi dialektlər çıxış edir.Azərbaycan dilinin Şirvan dialektindən danışarkən onu normasız mövcud olmasını demək yalnış olar. Şirvan dialektinin də özünəməxsus normaları vardır. Ünsiyyətin anlaşıqli olması üçün ədəbi dildə olduğu kimi, dialektlərdə də normalar vardır. «Demək olmz ki, dialekt üçün norma xarakterik devil. Normal, maneəsiz anlaşılan ünsiyyətin mümkünlüyü üçün dialektlərdə də norma mövcüddur, lakin ədəbi dil normasından fərqli olarq, bunlar ənənə ilə qorunur, şüurlu surətdə seçilmir və yazıya alınmır» . Ədəbi dili Şirvan dialektindən fərqləndirən cəhətlərdən biri də onun normalarının şüurlu olaraq seçilməməsidir. Yaxud meydana gəldikdən sonra ədəbi dilin normaları sabitləşməyə başlamış və yazı vasitasilə qorunub saxlanılmışdır.

**Açar sözlər: ədəbi dil,şirvan dialekti, fonetik norma, leksik və sintaktik norma**

**Ədəbi dilin formalaşmasında Şirvan dialekti** əsas baza kimi çixiş edir. Lakin bu o anlama gəlmir ki, həmin dialektlə ədəbi dil tam olaraq eyni məzmun daşıyır. Bu

haqda danışarkan A. S. Çikobava bunu aşağıdakı kimi geyd etmişdir: "Bu linqvistik yox, ictimai-siyasi xarakterli şəraitdan asıli, yəni ədəbi dilin yarandığı anda cəmiyyətin mədəni və ictimai-siyasi həyatında aparicı rolu hansı dialektin dominant rol oynamasından asılıdır." (1, səh.117-118). Ədəbi dil normaları xalqın ümumi istifadəsi üçün tam anlaşıqli bir formada yaradılır. Əgar burada hansısa bir dialektin üstünlüyünə yol verilorsa, digar qurup insanlar bu dialek faktlarını anlaması üçün çətinliklır yaranacaqdır.Ədəbi dilin formalaşmasında mərkaz dialekt faktorunun asas rola malik olması Wagainda V. Resetov öz fikilorini belə qeyd edir: Qeyd edilən dövrlərdən XIII-XIV asrlərdə Azarbaycan adəbi dilinin asasında Şirvan dialektinin durması Şirvan şəhərinin ictimai-siyasi cahatdan markaz rolunun oynaması ilə bağlıdır. Bununla yanaşı XVIII əsrdə adəbi dilin formalaşmasında **Şirvan dialektinin** əsas kimi çıxış etmasi həmin dövrdə Qarabağın Azərbaycan ictimai-siyasi mühitində başlıca rol oynaması,mərkəz mövqeyində durmasıdır. Həmçinin həmin dövr Azərbaycan ədəbiyyatında xalq dilinə yaxın ədəbiyyat nümunələrinin artması, M. V. Vidadi,M. P. Vaqif va s. şairlərin sadə dilə meyl etmesi dilin arabizimlərdən yüngülləşdirmə meylinin olması Azarbaycan ədəbi dilinin qərb dialektinin asasında inkişaf etməsinə zamin yaratmışdır. Ədəbi dil öz normalarini yazıda möhkəmləndirir və qoruyur. Əgər ədəbi dil yazıda öz əksini tapmazsa, dildaxili və dilxarici təsirlərin davamlı təsirinə məruz qalaraq tez-tez dəyişikliklərə uğrayaraq  ünsiyyət üçün çətinliklər yaratmış olacaqdır.Bu haqda Ə.Dəmirçizadə qeyd edir: "Ədəbi dildə sabitliyin təmin olunması normativ xususiyyətlərin yazıya alınması ilə mümkündür. Belə ki, ədəbi dil normasi nə qədər sabit olsa da, tarixi kateqoriya olduğu üçün dəyişir, ədəbi dildə normanın möhkəmlənməsi və hamı üçün vacibliyi prinsipinin təmin edilmasində yazınun rolu əvəzsizdir. "(2-s,10-12). Bu nümunaların yazıya köçməsi də adəbi dilin qərb dialekti əsasında inkişafina təkan vermişdir.Normalar öz əksini yazıda tapdıqca daha da möhkəmlənməyə başlamışdır

**Dost dostun yolunda düşar ziyana,Igid gərək tab gətirə dayana. M. P. Vaqif Qatar-gatar olub qalxıb havaya,Na çıxıbsız asimana, durnalar! M. V. Vidadi**

Azərbaycan ədəbi dilinin dialekt asasında formalaşma fikrinə əsaslanane demak olarki, müasir Azərbaycan ədəbi dilinin formalaşmasında Bakı-Şamaxı dialekti mərkəz mövqedə durmuşdur. XIX cü əsrdə paytaxtın Şamaxı şəhəri olması və Şamaxı zəlzələsindən sonra paytaxtın Baki şəhəirina köçməsi bu işdə iqtisadi mərkəz kimi Bakı şəhərinin rolunu artırmışdır. Buna görə də bütün dialektlərə mənsub insanlarn bura axını ilə Bakı şəhəri dialektlərin cəmləşməsi mərkəzinə çevrilmişdir. Bununla yanaşı ictimai-siyasi mərkəzə çevrilərək ədəbi dilin yeni mərhələsinin formalaşması üçün şərait yaranmışdır. Bu dövrdə mətbuatın inkişafi ədəbi dilin normalarının sabitləşməsinə kömək etmişdir.Mətbuatin yaranması ilə dialektlərdən gələn norma variantları üzərində seçmə  genişlənmiş və münasib variant yazıya gətirlərək möhkmlənmişdir.Azərbaycan dialektləri qərb, şərq, şimal va canub qrupu olmaqla dörd yerə ayrılır. Quba, Şamaxı, Bakı, Muğan və Lənkəran dialektləri şərq qrupuna; Qazax, Qarabağ, Gəncə dialektləri qərb qrupuna, Şəki və Zaqatala-Qax dialektləri şimal qrupuna,

Naxçıvan, Ordubad, İrəvan dialektləri isə cənub qrupuna daxildir. Har bir qrupun özünəməxsüs fonetik, leksik, qrammatik xüsusiyyətləri vardır.. Bu xüsusiyyətlər də adəbi dilin normalarının xüsusiyyətləri olsalar da, hamısı ədəbi dilin zənginləşməsində mühüm rol oynayır.. Dil tarixi proses olduğundan daim dəyişikliklərə məruz qalır. Ədabi dildə dəyişikliklər dilin bütün yaruslarında eyni dərəcədə getmir. Dil fonetik və leksik normalarda gedən dəyişikliyə daha çox məruz qalır. Dilin qrammatik variantlığın çoxluğu va danışıq zamanı dildə istifadə edilməsi, dil üçün münasib olanların seçilməsi ilə əlaqədardır.Dilşünas alim- tədqiqatçı EƏzizov yazır:"Şirvan dialektinə xas xüsusiyyətlərdən biri da cağır n-nin (n) olması ilə bağlıdır. Bu səs dialektlərdə müxtəlif səs çalarlarinin yarnmasına gətirib çıxarmışdır. Azərbaycan dili şivələrində samit düşümü nəticəsində sözdəki saitlərin uzun tələffüzü üçün şərait yaranmış olur. Saitlərin uzun tələffüz olunması səbəblərindən biri də **n** samitidir".(3-s.76).

Tarixi mərhələlərda samit səslər müəyyən bir yol keçərək öz yerini digər bir variantlara vermiş va bu variantlardan ədəbi dilə gətirilərək norma kimi götürülmüşdür. XX asrin 30-cü illərinə qədər bu əlifbada öz əksini tapsa da, sonralar əlifbadan cixarılmışdır. Bəzi dialektlərdə sait səslərin üzün tələffüz edilmesi kimi hallara rast gəlinməsi müşahidə olunur ki, bu da n samitinin təsirini olması ilə alaqədardır. Məsələn: ma: (mənə), sa: (səno), oa: (ona) gö:lüm (könlüm), gözəl (könül) və s. n səsinin sonrakı inkişaf yolunu və hansı mərhələlərdən keçərək norma halına çevrildiyini M. Şirəliyev aşağıdakı kimi qeyd etmişdir: "Daha sonralar qovuşuq "nq" səsi get-gedə öz hissələrinə parçalanmış, bir qrup dilaektlərdə bu səsin **n** ünsürü, başqa bir qrup dialektlərdə isə "q", "ğ","g" ünsürlərinə üstünlük verilmişdir. "G" səsinin yumuşalması nəticəsində onun yerina bəzi dilalekt va şivələrdə **y** səsi meydana gəlmiş, bəzi dialekt va şivələrdə isə **"g**" səsi **v** səsi ilə əvəzlənmişdir." Fonetikanın əsas normalarından biri də ümümtürk dil qanunu olan ahəng qanunundur. Ədəbi dillə müqayisədə dialektlərdə ahəng qanunu o qədar da möhkəmliyini qoruyub saxlaya bilmir.Azərbaycn dilinin Şirvan dialekti haqqında M İslamov yazır:" Azərbaycan dialektlərinin bəzilərində ahəng qanunu gözlənilsə də, bəzilərində bu qanun gözlənilmir."(4-s.16-23). Azərbaycan dialect qruplarını bu baximdan üç hissəyə ayırmaq olar.

1. Ahəng qnununun bəzi hallarda pozulduğu dialekt və şivələr. Bura Bakı, Quba, Lənkəran dialektləri və şivəlarini daxil etmək olar. Məsələn: **Alecek, tutacek, aleyam,dəneşerəm, dedıx, beşlıx və s.**

2. Əksər hallarda ahəng qanununa əməl olunan dialekt və şivələr; Qazax, Qarabağ, Gəncə dialektləri daxildir. Məsələn: **çanax,mağar, oxumuyuf, almıyıf, gözdüyür və s**. Bu qrupa aid dialektlərdə adəbi dilin normlarına zidd da olsa belə, bəzi hallarda ahəng qanunu qoruyub, saxlayır.Məsələn: **ilxı, ildırım və s.**

3. Ahəng qanunun az hallarda pozulduğu dialekt və şivələrdir ki, bura Şamaxı, Naxçıvan dialektləri və Muğan şivəsi daxildir.

Ədəbi dilin zənginləşməsində onun leksik tərkibi mühüm əhəmiyyətli dəyişikliklər və yeniliklər özünü dilin lüğət tarkibində göstarir.. Cəmiyyətin inkişafi ilə əlaqədar olaraq baş verən hadisələr dilin lüğat tarkibində də özünü biruzə verir.

Şirvan dialektlindən ədəbi dilə gələn sözlərin böyük bir qismi isə elm vasitəsi ilə dilə daxil olmuşdur. Bu prosesdə Həsən bəy Zərdabinin adını xüsusi qeyd etmək lazımdır. Onun təsis etdiyi "Əkinçi" qəzetində çoxlu sayda terminlər dialektlərdən ədəbi dilə gəlmişdir.Məs: yatalaq, yağışölçən, tullama, soyuq yer və s.

Ədəbiyyat:

1..” Лингвистический анализ диалектных слов современного русского языка”стр: 117-118.
2.Dəmirçizadə Ə.. "Azərbaycan dili orfoepiyasının əsasları." Bakı, "API nəşriyyati", 1969.səh:10-12
3.Əzizov E. "Azərb.Şirvan Dialekt sisteminin təşəkkülü və inkişafi." B, “ BDU. 1999, səh.76.
4.İslamov M. "Azərbaycan dilinin şirvan dialekti." Bakı, Azərbaycan SSR EA, 1968. Səh. 16-23

Е.Багирзаде

Роль фактора Ширванского диалекта в формировании норм Азербайджанского литературного языка

Резюме

В статье рассказывается об описании литературного языка и фактора диалекта в формировании литературного языка. Также затронута тема , как проведен процесс выбора между диалектами и литературным языком .

Наряду с фонетическим, лексическим отделами диалектов, также дана информация о синтаксическом отделе. В формирование литуратурного языка, рассказе о всех четырех направление диалектов, подчеркнуто их характеристик характеристика.

В статье помимо вышеуказанного ещё рассмотрено историческая путь Азербайджанская диалектологию. Без исключение точный, западный, южный или северный диалекты имеет важную значение для нормативы литературного языка. Диалекты постоянно играют важную роль в развитии литературного языка.

Основная доля в обновлении, изменении норм литературного языка принадлежит диалектам. В Связи изменением по требование языковая направление 4 мне каждом развивающее обществе, нормативе литературном языке нуждается возведение. Один из языковых факторов чтобы опередить таких вопросы считается диалекты. И по этой причине тема имеет особое значение

Ключевые слова: Литературный язык,диалект ширвана ,норма в литературном языке, фонетическая , лексическая и синтаксическая норма

E.Baguirzade

The role of the SHirvan dialect norms in the formation literature Azerbaijani

Summary

The influence of a dialect factorin the formation of literary language.disputed in the article. Also how the choise process among dialects and literacy language must be carried is considered. Beside phonetic, lexic departments of dialects, the syntactic one is also touched. In the formation of the literar .

Language, talked about the four dialect of our language and their particularities In addition to these, the historical way of Azerbaijan dialectology has been examined. Dialects are important for literary language norms such as east, west south, or north. Dialects always play an important role in the progress of a literary language.

Dialects are given main attention in the process of their changing, renovation. As the language needs of the developing society changes,the need for renewal in the norms of the literary language increases. One of the language factors that provides these are dialects. So this theme is played a special importance.

The disadvantages of traditional methods required new approaches or methods for teaching grammar, as well as the language which the learners could use in their real life. One of the approaches that set up thinking this goal was communicative approach. Communicative approach is based on communicative competence and interaction. According that fact the choice of materials must be related to the real-life situations and convince the learners to use the knowledge and grammar rules during their speaking

Key words:Literary norms,dialect shirvan, norms, literary language, phonetic norm, lexic norm, syntactic norms.

Redaksiyaya daxil olma tarixi: 05.08.2019
Çapa qəbul olunma tarixi:27.11.2019
filologiya üzrə fəlsəfə doktoru, dosent Adilə Zeynalova tərəfindən çapa tövsiyə olunmuşdur